


# Gözəl həyat

Müəllif : Muhəmməd Muxtar əş-Şinqiti

Tərcümə : Azər Mustafa

## Giriş

Bu kitabça dövrümüzün böyük alimlərindən olan Muhəmməd Muxtar Şinqitiyə məxsusdur.Alim haqda qısa da olsa qeyd edim ki, bir çoxlarımız onu internetdə tərcümə olunmuş qısa nəsihət tipli dərslərindən tanıyırıq.Şeyx Muhəmməd Şinqiti Mədinə İslam Universitetində dərs deyir.Şeyxin dərsləri insanın bütün həyatını bir anda dəyişdirəcək ibrətamiz və qəlbə təsir edəcək mövzuları əhatə edir.Bu kitabça da onun mühazirəsindən hazırlanmışdır.Mövzunun faydalı olduğunu düşünərək onu dilimizə tərcümə etmək istəyirdim, çünki bu mühazirəni dəfələrlə səs yazısı kimi qulaq asdıqdan sonra “bunu mütləq bütün insanlar dinləməli və düşünməlidir“ deyə içimdəki hiss məni rahat buraxmırdı.Allaha həmd olsun ki, onu dilimizə tərcümə etməyi Allah məni müvəffəq etdi.Allah bu kitabçanı oxuyanlar üçün faydalı etsin.

Tərcüməçidən

Bismilləhir-Rahmənir-Rahim (Rahmən və Rahim olan Allahın adı ilə)

## Tövbə və Allahın nemətlərini hiss etmək gözəl həyatın hasil olmasının səbəblərindəndir

Həmd Allaha məxsusdur.Şahidlik edirəm ki, yer və göylərin tək yaradısıcısı Allahdan başqa haqq ilah yoxdur və şahidlik edirəm ki, ən xeyirli risaləsi üçün seçdiyi ağamız və Peyğəmbərimiz Muhəmməd onun qulu və elçisidir – ona, ailəsinə, səhabələrinə və yer və göylər dağılan günə qədər onların yolu ilə gedənlərin üzərinə Allahın salamı və xeyir duası olsun.

Və sonra...

Əs-sələmu aleykum və rahmətullahi və bərakətuhu, mühazirənin əvvəlində bu görüşün təşkil olunmasına səbəb olan dəyərli qardaşları Allah ən üstün şəkildə mükafatlandırmasını, həmçinin Allahdan bu yığıncağın mərhəmət olunmuş bir yığıncağa çevirməsini və bizi dogru sözə və düzgün əmələ müvəffəq etməsini diləyirəm.

Ey Allah üçün sevdiklərim ! Bu gözəl həyat haqqında olan söhbətdir, bu hər birimizin yaşaması lazım olan bir həyatdır.Çünki həyat ya insanın xeyrinə ya da əleyhinədir. Bu həyatın saat və anları, gün və illəri insanın üzərindən ötüb-keçir, onu sevgi və razılığa aparır, ta ki o xilas olsun və cənnət əhlindən olsun. Yaxud da onun üzərindən ötüb-keçir və onu od-alova, tək Hakim, Hesaba çəkənin hüzuruna (Allaha) aparır.

Həyat ya səni bir saat sevindirər ki, həmişəlik ağlayasan, ya da bir saat ağladar ki, həmişəlik sevinəsən. Həyat ya insan üçün nemətdir ya da ki, bəla və müsibətdir. Bu həyat bizdən əvvəlkilərin, ata və babalarımızın, ondan qabaqkıların yaşadığı, sonra isə etdikləri ilə Allaha qayıtdıqları həyatdır.Həyat sənin yaşadığın hər andır, keçirtdiyin hər saatdır. Biz elə indicə bir həyat yaşayırıq – bu ya bizim xeyrimizə, ya da ki əleyhimizədir. Müvəffəqiyyət əldə etmiş, xoşbəxtçiliyi tapan biri əgər bu həyata nəzər yetirsə, onun haqqını və qədrini bilsə...Vallahi ki bu həyat dəfələrlə, təkrar-təkrar insanları ağlatmış və onların göz yaşları qurumamışdır, dəfələrlə də insanları sevindirmiş lakin onların bu gülüş və sevincləri onlara bir daha qayıtmamışdır.

Allah üçün sevdiklərim ! Allah bu dünya həyatını sınaq, imtahan və seçim yeri etmişdir. Burada qulların həqiqiqətləri ortaya çıxır. Allahın rəhməti ilə xilas olan xoşbəxtdir, onun razılığından məhrum olan, uzaqlaşan isə bədbəxtdir.Yaşadığın hər saatda Allah ya səndən razıdır, ya da əksidir – Allah qorusun - ,ya səni Allaha yaxınlaşdırır, yada ki səni Allahdan uzaqlaşdırır. Yaşadığın bu zamanda elə bir an

olur ki, onu Allaha itaət və sevgi ilə keçirirsən, həyatındakı bütün günahlar bağışlanır, bütün ömrün boyu etdiyin xətalar silinir. Bəzən isə elə bir an yaşayırsan ki, onda Allahın yolundan uzaqlaşırsan, Allaha itaətdən ayrılırsan, bu da insanın bütün həyatı boyu bədbəxt olmasına səbəb olur, Allah bizi belə haldan qorusun.

Bu həyatda iki dəvətçi var : Allahın rəhmətinə, razılığına və Allahın sevgisinə doğru, ikincisi isə bunun ziddinə çağırır – pisliyi əmr edən şəhvət (arzu, istək) və ya pis sonluğa çağıran yalançı dəvətçi. Elə olur ki, insan həyatında bircə an yaşayır və öz Rəbbinə qarşı etdiyi səhvə görə peşman halda göz yaşı axıdır, Allah isə onun bu ağlamasına qarşılıq günahlarını savablarla əvəz edir.Nə qədər insan günah işləyib, nə qədər insan pislik edib, nə qədər insan var ki, öz Rəbbindən ayrı düşərək uzaqlaşıb, Onun rəhmətindən kənar qalıb, Allahın razılığından qəribsəyib. Sonra onlara o saat, o an gəlib – yəni gözəl həyat, onların peşmançılıq göz yaşı axıtması üçün, qəlblərində vicdan əzabını alovlandırması üçün. İnsan məhz o anda hiss edir ki, o Allahdan artıq uzun zamandan bəri qəribdir, Ondan uzaqdır. Məhz bu anda o etiraf edib ki - mən Allaha tövbə edirəm, onun rəhmət və razılığına dönürəm.

Və bu saat peşmançılıq saatıdır, o insanın xoşbəxtçiliyi üçün açardır.Və necəki alimlər deyir : Həqiqətdə insan çox sayda günah edir, lakin əgər o peşmançılığında doğru olarsa, tövbəsində sadiq olarsa Allah onun günahlarını savablarla əvəz edər. Onun həyatı bu peşmançılıq səbəbilə, özü ilə sadiq olub tapdığı bu üzüntü və kədərdən dolayı yaxşılaşır. Ərşin sahibi əl-Kərim və Əzəmətli Rəbbimizdən istəyirik ki, bizi öz rəhmətinə çağıran dəvətçini, Ona qarşı nöqsan işləyərkən hiss etdiyimiz əzabı və peşmançılığı bizim qəlbimizdə diriltsin.

Allah üçün sevdiklərim ! Bizlərdən hər biri istər ki, öz nəfsinə gecələr və gündüzlər barədə sual versin. Nə qədər gecələri oyaq keçirtdin ? Nə qədər saatları itirdin ? Nə qədər bu həyatda güldün ? Bu gülüşlər Allahı razı salmaq üçünmü oldu? Nə qədər yuxusuz gecələr... ? Bu yuxusuz gecələri Allah səndən razı qaldımı? Neçə ... nə qədər...? ... Öz nəfsinə bu sualları verir, bəzən insan tələsərək soruşur : Niyə mən bu sualları verirəm ? – Bəli, bu sualları soruşursan, çünki yaşadığın elə bir göz qırpımı, elə bir an yoxdur ki, sən orada Allahın nemətlərini hiss etməyəsən, həya və utancaqlıqla başa düşürük ki, Allahın bizə verdiyi nemətlər nə qədər böyükdür. Biz hiss etməliyik ki, Allahın verdiyi ruzini yeyirik, onun yaratdığı suyu içirik, onun xəlq etdiyi örtük altında kölgələnirik, onun torpağında yeriyirik, onun rəhmətiylə yaşayırıq – bütün bunların qarşılığında isə biz ona nə cavab veririk ? İnsan gərək özü özündən soruşsun.

Həkimlər deyir : Həqiqətən də insanın qəlbində elə bir maddə var ki, əgər o 1% artıq və ya 1% əksik olsa o yerindəcə dünasını dəyişər. Elə isə Allah insana görün necə lütfkar, mərhəmətli, mülayim və şəfqətli davranır.

İnsan özü-üzünə yalnız Alahın rəhmətindən sual versin : İnsan yuxudan oyanarkən qulağı eşidir, gözləri görür, qüvvəsi yerindədirsə, onun qulağını kim mühafizə etdi ? Gözlərini kim mühafizə etdi ? Ağlını kim qorudu ? Ruhunu kim geri qaytardı ? Sual versin ki, bütün bunları kim ona yenidən qaytardı ?

İnsana sağlamlıq və yaşam sevgisindən həzz almağa imkan verən kimdir ? Budur, baxın ağ yataqlarda bu nemətlərin həsrətini çəkən, əzaba düçar olan xəstələrə... Lakin Alah bu nemətlərlə - sağlamlıq, əminlik, salamatlıq və yaşam sevgisiylə bizim qayğımıza qalır ki, biz gözəl həyat yaşayaq.

Gözəl həyatın hasil olma səbəbləri – onun fərz buyurduqlarını yerinə yetirmək, qadağalarından çəkinməkdir.

Allah öz qulundan 2 işi görməyini istəyir :

1-ci işi – onun fərzərini (vacib etdiklərini), buyurduqlarını yerinə yetirmək

2-ci işi – isə çəkindirdiyi və qadağan etdiklərini tərk etməkdir.Və kimsə desə ki, “Allaha yaxın olmaq əzab-əziyyətli həyatdır, sıxıcıdır və s.” – Vallahi ki, o Allaha qarşı pis zənn bəsləmiş olar.Əgər həyatın Allaha yaxın olmaqla, ona yaxınlaşmaqla yaxşı olmadısa bunu daha başqa heç nədə gözləmə. Əgər bu yaxşılıq onun fərzlərini yerinə yetirməklə, qadağalarından çəkinməklə olmadısa daha başqa yerdə yaxşı olmağı heç axtarma.Əgər insan həyatdakı bütün ləzzətləri dadsa, vallahi ki, o Allaha qulluq etməkdən daha yaxşı ləzzət tapa bilməyəcək – bu (ləzzət) onun əmr etdiyi vacibləri (fərzləri) etmək və haram (qadağan) etdiklərindən uzaq durmaqdır.

Sən 2 işlə mükəlləfsən (etməyə borclusan) : Qarşına hər hansı bir iş çıxsa onu ya edirsən, ya da etmirsən. Bu həyatda hər hansı bir işə başladıqda öz-özünə sual ver : Allah sənə bu işi etməyə icazə verir, yoxsa yox ?

Qəlblər, ruhlar, cəsədlər Allahın mülküdür, insan gərək bir işi qabağa çəkdikdə və ya sonraya saxladıqda özündən soruşsun : O bunu etsə Allah razıdırsa onda etsin, yox əgər razı deyilsə onda etməsin.Vallahi əgər İnsan Allahın rəhmətini umaraq hər hansı işini önə və ya arxaya çəkərsə Allah da onu asanlaşdırar.

Həqiqi səadət, həqiqi xoşbəxtçilik Allaha yaxın olmaqdadır.

Həqiqətən əsl səadət və gözəl həyat Allaha yaxınlaşmaq, ona yaxın olmaqla gerçəkləşir.Bu yaxınlıq kimədir ? – yerin və göylərin Xaliqi, yaratdıqlarının sahibi, əmr etmək və hökm vermək ona məxsusdur, yaradılış onun əsəridir, idarə etmək onun səlahiyyətindədir.Buna baxmayaraq sən insanı daima təşviş və gərginlik, narahatçılıq içində görürsən.

Bütün ləzzətlərin dadını çıxaran birini tap, sən onun bu kef və ləzzətləri dadmasına baxmayaraq insanlar içidə ən çox əzab, məşəqqət çəkən, darıxan biri olaraq görəcəksən.Get və elə indicə insanların ən varlısını axtar tap, sən onun həyatda ən çox sıxıntı çəkən insan olduğunu görəcəksən. Niyə ? Çünki Allah ruhların təskinlik tapmasını və rahatçılığını özünə yaxınlaşmaqla, həyatın ləzzətini, həyatla ünsiyyəti öz ünsiyyətinə bağlayıbdır.

Və insan Allahın buyurduğu bircə fərz namazı qılması, adicə hər bitirdiyi ruku, səcdə və öz Rəbbinə etdiyi ibadət sayəsində məsciddən çıxarkən nəfsi elə rahatlıq tapır ki, vallahi əgər o dünyanın var-dövlətini fəda etsə heç vaxt bu ləzətti duya bilməz. O zaman bilin ki, gözəl, xoş həyat yalnız Allaha yaxınlaşmaqdadır.Əgər gözəl həyatı Allaha yaxınlıqda tapmadınsa, onda sən bunu başqa nədən gözləyirsən?

## Alaha yaxın olmağın maneələri

Burada 3 maneə var ki, sənin Allaha yaxın olmağının qarşısını alır :

1-cisi – Şəhvət (yəni arzu və isəklər) – Sənin Allaha yaxın olmağına qarşı səddir.

2-cisi – Allaha qarşı pis zəndə olmaq, onun haqda pis fikirdə olmaq.

3-cüsü – Şeytandır – O da özünə söz verib, əhd edib ki, səni Allahdan uzaqlaşdırsın.

O ki qaldı şəhvətə - O bir saatlıq ləzzət və həyatı boyu çəkilən peşmançılıq və dərddir...Oyun və oyuncaq şəhvəti ki, Allah bu dünya həyatını oyun və əyləncə kimi vəsf etmişdir.Lakin nə qədər cəsədlər bu oyun və əyləncələrə dalmışlar ki, onlar indi dar qəbirdə sıxıntı çəkir. Nə qədər qəbir quyusunun sıxdığı insan vardır ki, onlar Allahı zikr etmək, Allaha itaət etmək arzusundadırlar.

O insan bu həyatın qiymətini və onu Allaha asiliyə çağıran şəhvətin həqiqətini başa düşmədi.Və sən insanın bu dünyadan köçərkən peşman olduğu qədər daha sadiq bir peşmançılıq tapa bilməzsən. İnsan o zaman onun qarşısında maneə olan bu şəhvətin həqiqətini başa düşəcək ki, artıq o həyatdan ayrılır. Ona həyatdan ayrılıq anı gələrkən peşman şəkildə ağlayar. Bu insan hətta saleh biri olsa da belə deyər ki: ﴿ قَالَ رَبِّ ارْجِعُونِ (99) لَعَلِّي أَعْمَلُ صَالِحًا فِيمَا تَرَكْتُ ﴾

“Deyər : Rəbbim məni geri qaytar.100. Ümid edirəm ki, tərk etdiyim saleh əməlləri edərəm” (Muminun 99-100) – və bunu təmənni edər – hətta saleh kəs də qayıtmağı və əməl dəftərinə xeyir artırmaq üçün bunu Rəbbindən istəyər.

Gərək insan aldanmasın və deməsin ki : “Bu ölüm saatı uzaqdır” – düşünməsin ki, o hələ gəncdir, xeyr Valahi nə qədər hadisələr insana gəncliyinin güclü, qüvvətli, çiçəkləndiyi dövrdə, şiddətli sevinc anı və yaşının ən mükəmməl anlarında baş vermişdir.Ona görə də insan gərək bu şəhvət və istəyin həqiqətini dərk etsin.Allah azzə və cəllə bizi şəhvət, arzu və istəklərdən əsla məhrum etməyib, bizə ləzzət almağa maneə də qoymayıb. Lakin bu arzu, istək və ləzzət üçün müəyyən bir vaxt, müəyyən bir məkan təyin etmişdir – əmin, salamat, sağlam, təmiz olan, və sənə öz istəklərini bu məkandan başqa yerdə etməyinə izn verməyib.

2-ci maneə isə - Allaha pis zəndə olmaqdır.Bəzi insanlara deyəndə ki : Allaha doğru gəl, ona yaxın ol ! – sənə belə deyər : “Ey qardaşım ! Niyə məni bezdirirsən, sıxıntı verirsən ?! İmkan ver həyatdan ləzzət alım ! İmkan ver gecəni istədiyim kimi keçirim, istədiyim kimi gedim, istədiyim kimi gəlim, hansısa bir hədd-hüdud tanımadan !” – elə hiss edir ki, Allaha yaxınlaşdıqda həyat sıxıcı və əzab-əziyyətli olur !! Vallahi və sonra yenə vallahi ! Allaha yaxınlaşmaqdan daha yaxşı bir yol yoxdur ! Və kim Allaha yaxın olmağın ləzzətini duymaq istəyirsə Allaha itaətini və saleh əməllərini artırsın. Allahın sevgisini cəlb etdirən, onun razılığına çağıran əməlləri çoxaltsın, ta ki Allaha ibadətin ləzzətini hiss edəcəyi saata qədər.

İnsana Allaha itaət və onun məhəbbətinə nail olmağa əngəl olan 3-cü maneə isə - lənətlənmiş şeytandır.( Bəzi insanlar nə pis əməl edirsə hər şeyi cin və şeytanın üzərinə atır, şeyxin də göstərdiyi kimi heç də hər şey cin və yaxud şeytandan asılı deyil, ilk 2 maneə bir daha göstərir ki, əsas səbəblər insanın özündən və nəfsi ilə mübarizə apara bilməməsindən qaynaqlanır – tərc.) Bu şeytan 2 növdür – insanlardan olan şeytanlar və cinlərdən olan şeytalar.Və kim Allaha yaxınlaşmaq istəsə o gərək insan və cinlərdən olan şeytanlardan uzaqlaşsın.İnsanlardan olan şeytanlara gəldikdə isə onlar o kəslərdir ki, Allaha itaətə razı olmurlar və bundan boyun qaçırırlar, insanın Allahın rəhmətindən ümidini üzər və ruhdan salarlar. İnsan gərək onlara qulaq asmasın və bilsin ki, əsl dost sevgi, məhəbbət, yoldaşlıqda ona qarşı doğru olan, ona eyiblərini göstərən, onu Rəbbinin sevgisinə, Yaradıcısına ibadətdə itaətkar olmağa çağırandır.

Cinlərdən olan şeytanlar isə insanın qəlbinə vəsvəsələr atar, ona deyər : “Gözlə, hələ nə qədər ömrün var, tələsmə, bu həyatdan ləzzət al, həyatın şəhvətlərindən ləzzət al, gecəni istədiyin kimi keçir, bu həyatın ləzzətləri ilə istədiyini et, həyat uzundur” – beləcə insana arzular verər, təsəlli verər və unutdurar, ta ki onu həlak yollarına təslim edənə kimi – Allahdan bizi və sizi bundan qorumasını istəyirik.

## Allaha yaxınlaşma yolundakı maneələrdən uzaqlaşmağın yolları

Allah üçün sevdiyim qardaşlarım ! Gözəl həyat bu üç amilə qarşı zidd yaşamaqla mümkündür.Şeytan dəvətçisinə gəldikdə insan onu ər-Rahmənin dəvətçisi ilə dəyişməlidir. İnsanlardan olan şeytanları Allahdan qorxan qullar və saleh dəvətçilərlə, Allaha olan pis zənni isə ona qarşı yaxşı zənlə əvəz etməlidir.

Şeytanın dəvətçisini ər-Rahmının dəvətçisi ilə dəyişmək necədir ? – Öz nəfsinə Allahın kitabını təqdim et, özün üçün hər gün Quran oxumağa vaxt ayır! Gənc insan elə bilməsin ki, bu Quran başqaları üçün endirilib. Vallahi sən bu Quranla qarşı-qarşıyasan (Rəbbin sənə bu kitabla xitab edib), istəsən də istəməsən də, yaxın da olsan, uzaq da olsan, hər bir insana qiyamət günü bu Quran onun ya lehinə ya da əleyhinə dəlil olaraq gələcəkdir. İnsan gərək deməsin ki : “Bu Quran mənlik deyil, başqaları üçündür”. – Xeyr, Quran elə sənlikdir, sənin üçündür və sən bu kitabla xitab olunmusan, hətta Allaha itaətdən ən uzaq insan olsan belə sən bu Quranla soruşulacaqsan. O da ya sənin xeyrinə, ya da ki əleyhinə (şahid) olacaqdır.

Bu şeytani dəvətçini Allahın kitabı ilə əvəz et, onu oxumaq qəlblərin rahatçılığı, kökslərin sevinc və fərəhlə dolmasıdır.

Allah təalə öz kitabında buyurur : ﴿أَلَا بِذِكْرِ اللَّهِ تَطْمَئِنُّ الْقُلُوبُ﴾” Qəlblər yalnız Allahı zikr etməklə sakitlik tapar” (Rad 28).Öz nəfsinə Allahın kitabını təqdim et ki, Allahın sənə xitabı ilə onun rəhmətində yaşayasan. Öz nəfsini Allaha dəvət edənə ərz et ki, Allahın sənə Quranda nəyi əmr edib və hansı qadağalardan çəkindirdiyini bilib öyrənəsən.

Pis dəvətçiləri xeyir dəvətçiləri ilə əvəz etmək isə - saleh insanlarla oturmaq, zikr (elm) halqalarına baş çəkməkdir ki, bundan heç vaxt peşmançılıq çəkilməz. Salehləri ziyarət etmək, onlarla ünsiyyət qurmaq, onları sevmək insan üçün dünya və axirətinə xeyirlidir. Bu cür insanlar necə də yaxşı bir toplumdur.

Elə bir vaxt olmaz ki, insan saleh biri ilə otursun və ondan xeyir görməsin. O onu yalnız və yalnız dininin, dünyasının və axirətinin islahına yönəldər.Pis yoldaş isə bunun tam əksidir - o insanı Allahın haram etdiklərinə çağırar. Əgər insan öz-özünə hansısa etdiyi asilik barədə düşünsə o zaman bunun arxasında mütləq bir pis yola çağıran tapar. Bu dəvətçi insanlardan olan şeytanlardır ki, bizə o asiliyi gözəlləşdirir və ona nail olma yollarını asanlaşdırır.

İnsan pis və şərliləri xeyirli olanlarla dəyişməlidir.Xeyirli insanlara deməlidir ki: “Sizinlə oturmaq, sizinlə ünsiyyətdə olmaq istəyirəm” – onları ziyarət edər və onlarla oturar. Buna görə də bəzən olur ki, insan zikr məclislərindən birinə gəlir və saleh insanlarla bircə dəfə oturur, sonradan isə bu ziyarət, onlarla oturmaq onun

cəhənnəm odundan xilas olmasına səbəb olur.Bu barədə Peyğəmbərimizdən–*sallalahu aleyhi vəssəlləm*– varid olan hədisdə deyilir : “Allah cənnət əhlini cənnətə qoyar, onlar oradakı nemətlərdən ləzzət alarlar.Sonra deyərlər : Ey Rəbbimiz ! Biz necə cənnətdə ləzzət alaq ki, qardaşlarımız əzab çəkir ?...”. Onların qardaşları kimdir ? Onlarla bərabər olan, lakin günahları olan insanlardır. Məsələn : Bir kişi salehlərlə bərabər olur, lakin bəzi günahları olur – içki içir və ya zina edir və ya Allahın haramlarından hansısa birini edir – belə çirkin əməllərdən Allaha sığınırıq – Allahın istəyi belə olur ki, o bu günahlara görə tövbə edə bilmir. Qiyamət günü gəldikdə Allah onu Cəhənnəmə daxil edir. Onunla bir məclisdə olan saleh biri Cənnətə daxil olduqda deyər : “Ey Rəbbim ! Qardaşım orada əziyyət çəkdiyi halda mən cənnət nemətləri ilə necə kef çəkim ?”. Allah ona şəfaət etməsi üçün izn verər. Rasulullah–*sallalahu aleyhi vəssəlləm*– deyir : “ İnsan şəfaət etməyə davam edər, ta o vaxta qədər ki, onunla Allahı zikr məclisində bir anlıq oturan belə bu şəfaətdən nəsibini alar.” Bir an Allahı zikr etmək insan üçün şəfaəti vacib edir. Bu salehlərlə oturmağın xeyirlərindəndir.

Həmçinin salehlərlə bərabər olmağın xeyirlərindən : Qəlblər və kökslər Allahın zikri ilə genişlənir və rahatlıq tapır. Ona görə saleh kəslərlə oturan biri oradan qalxdıqda nəfsi ruh yüksəkliyi ilə dolur, Allaha itaətə bağlanır. Bu anda istəyir ki, onu Allaha bağlayan, yaxınlaşdıran hər hansı yaxşılığı etsin.Vallahi insan elə saleh və müvəffəq biri ilə oturar ki, onu Allaha yönəltsin. Həqiqətən də əsl dost məhz belə biridir. Sən onun yanından qalxdıqda halın əvvəlki halından daha yaxşı olur.Bəzi insanlar mübarəkdir (bərəkətlidir), onunla oturursan, onun yanından qalxdıqda isə qəlbin Allaha bağlanır, ürəyin və ruhun Allahın razılığını və yalız ona yönəldən şeylərdən başqa heç nə istəmir.Yalnız Allaha yaxınlaşdıran xislətləri istəyirsən. Bəzən Allahın zikri olan bir məclis insanın bütün həyatını dəyişir. Əlbəttə ki, əgər o Allaha qulluğunda sadiq olar, ona deyilən Allahın əmrlərini edib qadağalarından çəkinərsə bu gerçəkləşər.

Məqsəd odur ki, saleh kəslərlə oturub-durmaq, onlarla bərabərlik insanı öz Rəbbinə yönəldən mühüm səbəblərdən sayılır. Əməlisaleh kəslə oturmaqda fayda odur ki, sən Allahı unutduqda yadına salar, əgər Allahı yada salarsansa sənə bunda yardım edər.

Yaxşı bir insandan eşidilən gözəl bir kəlimə ilə qəlblər genişlənir. Saleh birinin verdiyi doğru nəsihətlə Allah insanların halını islah edir. Ərşin Sahibi Əzəmətli və əl-Kərim olan Rəbbimizdən bizi və sizi Saleh insanların məclisləri ilə nemətləndirməsini istəyirik. Rasulullah–*sallalahu aleyhi vəssəlləm*– demişdir ki, salehlərin məclislərini mələklər əhatə edir – bu da zikr məclisləridir, bununla insanın vaxtı səmərəli olur və həyatı yaxşılığa doğru dəyişir.

O ki qaldı Allaha qarşı pis zənni yaxşı zənlə əvəz etməyə, bu iş hər bir insan üçün olduqca mühümdür. Allah sənin düşündüyündən daha geniş rəhmət sahibidir. Əgər sən ona bir qarış yaxınlaşsan, O sənə bir disək yaxınlaşar, sən bir dirsək yaxınlaşsan, O sənə bir qulac yaxınlaşar, əgər ona tərəf yeriyərək getsən, O sənə yüyürərək gələr. Hər bir kəsin düşüncəsində və ağlının bir kənarında olmalıdır ki, ona Allahdan daha çox mərhəmət edən heç kəs yoxdur.Vallahi əgər insan bu dünyanın bütün günahları ilə yüklənsə və sonra bircə anda o Allaha tövbə edərək gəlsə, Allah qarşısında acizanə dayanıb onun rəhmətinə ümid etsə, Vallahi ki Allah onu öz mərhəməti ilə məyus etməz, onun ümidini boşa çıxartmaz. O istənilənlərin ən səxavətlisidir (əl-Kərimdir), ümid olunan və yalvarılanların ən üstünü və ən əzəmətlisidir.

Həqiqətən də tövbə edənlərin qissələrində ibrətlər vardır. Bəzən insan həyatının bütün günahlarına tövbə edir, Allah azzə və cəllə bir andaca onun bu tövbəsini həyatının hamısını bağışlaması üçün səbəb edir. Buna ən bariz şahid bu gözəl şəhərə (Səudiyyə Ərəbistanında olan Məkkə şəhərini nəzərdə tutur – tərc.) Allah üçün gələn bəzi hacıları göstərmək olar.Məsələn : Baxırsan ki, 70 yaşı var və heç vaxt Allahı tanımayıb, həyatını asiliklər, günahlar, pisliklərlə keçirib və ömrünün axırında isə Allaha tövbə edərək, ona tərəf yönələrək gəlib. Həqiqətən də bu halda insan öz göz yaşlarına sahib ola bilmir.

Bu danışacağım qissə onlardan birinə aiddir: Mədinənin yaşlı nəslindən bir kişi ilə bərabər idim, mənə dedi ki, bu ilin həcc vaxtında ibrətli bir hadisə oldu, deyir : Burada bir dostumuz var idi, Allaha qarşı o qədər asi idi ki, onunla oturmaqdan belə qorxurduq. Çox günahlar edirdi – Allah qorusun, Allah elə istədi ki, ömrünün axırında həcdən qabaq xəstəliyə düçar oldu, xəstəxanaya düşdü və əməliyyat keçirdi. Oradan çıxanda artıq qüvvədən düşmüş, gücsüz vəziyyətdə idi, o dərəcədə ki, halının ağırlığını Allahdan başqa heç kəs bilmirdi. - danışan qeyd edir ki : Əməliyyatdan sonra sağalma dövründə oturur, rahatlaşır və bədəni dinclik tapır - bu həcdən təqribən bir ay qabaq olur. Allahın istəyi ilə xəstəlikdən çıxıb sağalmasına az günlər qalmış, həcc günləri yaxınlaşarkən o övladlarına ərk edərək həcc etməsini istəyir. Bu kişi imkanlı və nüfuzlu, adlı-sanlı biri olur. Ona deyirlər : “Ey ata, sən zəifsən, xəstəsən, əməliyyatdan çıxmısan, həcc etməyə taqətin çatmaz” , (Xəstə kişi) deyir : “Yox, həcc etmək istəyirəm !” Övladlarından yalnız biri ona həcc etmək üçün yardım edir.Kişi həyat yoldaşı ilə birgə səfərə çıxır.Allahın izniylə onlar Ciddə şəhərinə gəlirlər, yeddinci gün keçir və o həcc etmək istəyir. Məkkəyə tərəf yol üstündə ikən dayanıb dərindən nəfəs alır və ürəyindən ağrı çəkməyə başlayır. Onun həyat yoldaşı nəql edir ki – kişi oturur və bu kəlimələri deyir: Lə iləhə illəllah, Lə iləhə illəllah, Lə iləhə illəllah – qadın ona

deyir : “Sənə nə oldu?” Kişi deyir : “Ölüm” – sonra “Lə iləhə illəllah” – deyir və elə o dəqiqədəcə canını Allaha tapşırır.

Bu Allahın rəhmətinin genişliyinə dəlalət edir. Bu kişi həyatı boyunca Allahdan uzaq olur, Allah isə ondan intiqam almır. O asilik üzərə olarkən Allah onu həmin an yerin dibinə batıra bilərdi.Vallahi əgər Allah yerə izn versəydi o asilik edəni bircə anda batırardı. Allah mülk sahibidir, kamillik, güc-qüvvət, böyüklük ona məxsusdur, ətrafdakı bütün hər şey onun əmri, idarəçiliyi, səltənəti altındadır. Subhənəllah ! İnsan ona qarşı asilik edir, lakin bununla bərabər Allah ona sağlamlıq verir, ona günahdan ləzzət almağa imkan verir. Allah ondan canını bir andaca almağa qadir olduğu halda bu asiliyinin üstünü örtüb gizlədir.

Subhənəllah ! O necə də İnsana qarşı Həlimdir ! İnsan sağ-salamat halda günah edir, Allah isə onun eyiblərini örtür, hələ bundan sonra da insanı çağıraraq deyir : “Mənim rəhmətimə tələs, yer və göylər qədər genişliyi olan Cənnətimə tələs ey qulum !” Səndən yalnız doğru danışıq və yaxşı əməl istəyir, bundan başqa səndən heç bir tələbi yoxdur !

“Allaha yaxın olmaqda sıxıntı var !” – sözünü deyən insan doğurdan da əsl yalançıdır. Xeyr Vallahi, Allahın səndən istədiyi yalnız gözəl sözlər, gözəl əməllər və onu razı salacaq əqidədir.Yalnız bu üç şey : nöqsan, əksiklik və əxlaqsızlıqdan uzaq düzgün qəlb, yaxşı sözlər danışan dil və xeyir işlər görən əməllər. – Bunlardan başqa əsla heç nə ! İnsanları söymək və ya təhqir etmək yox, əvəzinə bu xeyirxah əməlləri etməlidir. Bizdən insanlarla gözəl danışmaq, onlara ehtiram bəsləmək tələb olunur.Ən alçaq insanın belə etmədiyi pis əməlləri etməz, əvəzində o bu əməlləri yerinə yetirər. Özünə hörmət edər, Allahla görüşəcəyinə inanan bir müsəlmana layiq olan əməlləri görər, başqa heç nə ilə vaxtını keçirməz.

Bizdə itaət etmək və gözəl həyatı yaşamaq üçün bu 3 şeydən başqa heç nə yoxdur : Düzgün əqidə, doğru söz və yaxşı əməl.Kim bu üç tələbi həyata keçirərsə Allah onu özü ilə qarşılaşacağı ana qədər qoruyar, onu sevər və ondan razı qalar :

﴿ مَنْ عَمِلَ صَالِحًا مِنْ ذَكَرٍ أَوْ أُنْثَى وَهُوَ مُؤْمِنٌ فَلَنُحْيِيَنَّهُ حَيَاةً طَيِّبَةً وَلَنَجْزِيَنَّهُمْ أَجْرَهُمْ بِأَحْسَنِ مَا كَانُوا يَعْمَلُونَ ﴾

“Mömin olaraq yaxşı iş görən kişi və qadınlara əlbəttə gözəl həyat bəxş edəcək və etdikləri ən yaxşı əməllərə görə onları mütləq mükafatlandıracağıq.”(Nəhl 97)

Əgər sən bu 3 tələb olunanı etsən Allah and içir ki, sənə gözəl həyat yaşadacaq. Ona görə də elə bir insan tapa bilməzsən ki, Allaha itaət etsin, sonra da başqasından qorxsun. Bunu özün təcrübədən keçir - qorxu yalnız Allaha asi olmaqdan meydana gəlir.

Və haqqında bəhs etdiyimiz bu qoca kişi həyatı boyu Allahdan uzaq olmuşdu. Mənə bu əhvalatı danışan yaşlı kişini özüm şəxsən Mədinədən tanıyıram. İndi o həyatının son çağlarını yaşayır.Vallahi o bu qissəni danışanda göz yaşlarını saxlaya bilmirdi. Mənə deyir ki – “Subhənəllah ! Allah necə də Həlimdir ! Allah necə də Lətifdir ! Onun həyatının axırını belə gözəl sonluqla bitirdi.” Bu nəyə işarə edir? Təbii ki  Allahın rəhmətinə... Burada artıq Allah barədə pis zənn qala bilməz.

Şeytan insana yaxınlaşır və ona belə deyir : “Sən bunları, onları etdin, Allaha and olsun Allah səni heç vaxt bağışlamayacaq !” İnsan hansı asiliyi, Allaha qarşı hansı günahı işləmiş olsa belə – hətta böyük günah olsa da belə deməlidir : “Allahım mən sənə tövbə etdim !” – Allah da onun bu günahlarını savablarla əvəz edər. Allah təalə deyir:

﴿ إِلَّا مَنْ تَابَ وَآمَنَ وَعَمِلَ عَمَلًا صَالِحًا فَأُولَئِكَ يُبَدِّلُ اللَّهُ سَيِّئَاتِهِمْ حَسَنَاتٍ وَكَانَ اللَّهُ غَفُورًا رَحِيمًا ﴾

“Ancaq tövbə edib iman gətirən və saleh əməllər edənlərdən başqa. Allah onların pis əməllərini yaxşı əməllərlə əvəz edər. Allah Bağışlayandır, Rəhmlidir!” (Furqan 70)

Bu kəlimələr bizim hamımıza deyilir. Bu sözlər hamımıza aiddir, çünki əsas vacib olan möminin hər bir anda Allaha yaxın olmasıdır. Burda elə bir insan yoxdur ki, o Allaha asi olmasın və ya günah etməsin. Biz gərək daima gözəl həyatı bizə yaşadacaq bu 3 şeyi axtaraq və tələb edək.

Gözəl həyatın səmərələrindən biri də dualara cavab verilməsidir.

Gözəl həyatın nəticələrindən : Əgər sən Allaha tərəf gəlsən... -  burada əcaib və incə bir qayda var - əgər başına hansısa bir müsibət gəlsə, itki baş versə, sən gözəl günlərini və dostlarını itirsən də bir kəs var ki, sən onu heç vaxt itirməzsən, O da İzzətli və Uca olan Allahdır. Əgər sən Allahın hüzuruna bu 3 tələbi yerinə yetirmiş halda gəlsən - əqidən düzgün olsa, gözəl söz danışsan, yaxşı əməl etsən, əllərini qaldırıb – “Ey Rəbbim !“ – deyə çağırdığın elə bir an olmaz ki, Allah sənin duana cavab verməsin, vəya desən ki: “Allahım səndən istəyirəm” – Allah da sənin istəyinə cavab verər. Buna görə də hədisdə varid olmuşdur ki : “Qul Saleh bir kəs olarsa göylərdə (səmada) tanınan biri olar”, çünki saleh əməl Allaha ucalır.Əgər səndən gözəl sözlər çıxar və səmaya qalxarsa...məsələn sən daima desən “Lə iləhə illəllah, əstəğfirullah, yaxşı sözlər danışsan, insanlara yaxşılıq etsən, saleh əməllər işləsən – bütün bu əməllərin səmaya ucalar, bunlara görə mələklər səni sevər, Allah səni səmalarda özünə yaxın mələklərə sevdirər. O zaman ki, sənə dərd və üzüntülərdən bir şey gələrsə, çıxılmaz vəziyyətə düşsən və ya qorxduğun bir hadisə başına gəlsə - onda desən ki – “Ey Rabbim!” – səmalarda olan mələklər deyər :

“Bu həmin tanıdığımız qulun səsidir” - Kimdir o ? O Allaha itaət edəndir. Bununla (bu saleh əməllərlə) qul o dərəcəyə çatar ki, Allaha dua edən kimi Allah onun duasına cavab verər. İnsana bu gözəl həyatı yaşamağa mane olan nədir ?

Əgər sən bir andaca Allaha xalis ibadətinlə və doğru itaətinlə buna nail olsan və desən : “Ey Rabbim !” – Allah duanı cavablandırar. Bu necə gözəl məqam, mövqe, necə də böyük şərəfdir ?! Budur əsl izzət və şərəf, budur əsl hörmət, budur hər bir insanın haqqında düşünməli olduğu gözəl həyat, onun hasil olması üçün çalışmalı olduğu sahə.

Təkrar edərək deyirəm : Bütün sıxıntılar Allaha qarşı üsyan etməkdə, ona asi olmaqdadır. Bütün genişlik və rahatlıq isə Allaha yaxın olmaqdadır.Allahın İzzət və cəlalı, gözəl adları ilə bizə gözəl həyat yaşatmasını diləyirik.

Gözəl həyatın səmərələrindən : İstiqamət üzrə sabit olmaqdır.

Gözəl həyat sahibinin əldə etdiyi ikinci xislət isə istiqamət üzrə sabit olmasıdır. Elə bir insan yoxdur ki, gələcəkdə bu dünyadan köçməsin, istər yaxın zamanda olsun və ya çox sonralar. Heç kəs də zəmanət verə bilməz ki, bu məclisdən qalxacaq, yoxsa yox (Şeyx bunu mühazirədə olanara xitabən deyir). Bu an gələcək və o - ayrılıq anıdır. Elə isə sabitqədəm və əməlisaleh olmağın nəticələrindən biri də insana Qiyamət saatı gəldikdə, bu həyatdan ayrılıq anı yaxınlaşdıqda onun ən gözəl anı Allahla qarşılaşma anı olur. İnsanlar ölüm anı gəldikdə qorxur, bircə gözəl həyat sahibindən başqa. Ölüm ona gəldikdə o hiss edir ki, Allaha doğru istəyi, şövqü var və onunla qarşılaşmağa can atır. Buna görə gözəl həyat sahibinə ölüm sərxoşluğu yaxınlaşdıqda köksünün genişlənməsi, rahatlaşması, ruhunun sakitləşməsini görərsən, hətta bəziləri ruhunu təslim edərkən təbəssüm də edir. Ərşin Sahibi əl-Kərim olan Rəbbimiz, Əzəmətli Allahdan istəyirik ki, bizi və sizi bu cür salehlərdən etsin və həyatdan gözəl şəkildə ayrılarkən özünə bu sözlər deyilsin : ﴿ لَا خَوْفٌ عَلَيْكُمْ وَلَا أَنْتُمْ تَحْزَنُونَ ﴾”Sizə bugün qorxu yoxdur və siz kədərlənməyəcəksiniz” (Əraf 49)﴿ ادْخُلُوا الْجَنَّةَ بِمَا كُنْتُمْ تَعْمَلُونَ ﴾”Etdiklərinizə görə cənnətə daxil olun”(Nəhl 32).Əzəmətli Allahdan bizim bu həyatda ən xoşbəxt və ən sevincli anımızı dünyadan ayrılıq anında bizə yaşatmasını istəyirəm.

Bunlar insanın əldə etdiyi səmərələrdir, insan gərək dediyimiz işlərdə əlindən gələn qədər, bacardığı qədər çalışsın : Düzgün batin (qəlb) və düzgün zahir – söz və əməllərlə. Sən gərək biləsən ki, Allah sənin dediyin sözlərdən razıdır. Yalnız o halda danışasan və yalnız Allahın razı qaldığı əməlləri edəsən. Əzəmətli Allahdan, Ərşin Sahibi Rabbimizdən istəyirik ki, bizi və sizləri söz və əməllərimizi düzəltməyə müvəffəq etsin, həqiqətən də O buna yönəldən və buna Qadir birisidir.

Və indi suallarınız üçün də imkan vardır...Peyğəmbərimizə onun ailəsinə və səhablərinə Allahın salamı və xeyir-duası olsun.

Şeyxin tələbəsi : Bu kəlimələrlə qəlblərimizi diriltdən şeyximizi Allah xeyirlə mükafatlandırsın və Allah təbərakə və təalədən istəyirik ki, bizi sözə qulaq asan və onun yaxşısına tabe olanlardan etsin.

Suallar

İstehza edənlərə fikir vermə, gözəl aqibət müttəqilərindir (Allahdan qorxanlar üçündür)

Sual : Möhtərəm şeyx, mən sərt qəlbli biriyəm, istəyirəm tövbə edim və qəlbim yumşalır, gözəl və xoşbəxt həyat yaşamaq istəyirəm. Lakin başqalarının mənə istehza edib lağa qoyacaqlarından qorxuram, nə edim ? Bunun həlli yolu nədir ? Allah sizi xeyirlə mükafatlandırsın.

Cavab : Bismilləh, Həmd Allaha məxsusdur, Peyğəmbərimizə onun ailəsinə, səhabələrinə və onların yolu ilə gedənlərə Allahın salamı və xeyir duası olsun.Və sonra :

Ey Allah üçün sevdiyim qardaşım, sənə müjdələr olsun ki, Allahdan bütün xeyirləri umursan. Nə qədər ki, hiss edirsən qəlbin sərtdir və bu daş ürəkli olmağından peşmançılıq çəkirsən, bu sənin üçün xeyirin başlanğıcıdır. Allah insanın qəlbinə yalnız o zaman peşmançılıq hissini qoyur ki, onu özünə yaxınlaşdırmaq istəyir. Ey Allah üçün sevdiyim qardaşım, sənə nəsihət edirəm ki, Allaha tərəf yaxınlaşasan, gərək sənə nə istehza edənlərin istehzası, nə də lağa qoyanların ələ salması aləmlərin Rabbinə itaət etmənə mane olmasın.Həqiqətən də qəlblər ər-Rahmənin barmaqları arasındadır, onları istədiyi kimi çevirib dəyişir. Vallahi əgər sən Allaha itaət etsən sənin hörmət və nüfuzunu, heybətini qəlblərə yerləşdirər. Birinci günü istehza edərlər, ikinci günü gülərlər, üçüncü gün görərsən ki, qəlblər artıq dəyişilibdir. Bunu yoxla, özün görəcəksən. Biz də bunu dəfələrlə görmüşük. Elə ilk görəcəkləri iş səninlə istehza etmələridir, nəyə görə ? Peyğəmbərimiz*–sallalahu aleyhi vəssəlləm–* deyəndə ki – Lə iləhə illəllah –deyin, ona lağ elədilər, səhabələr bir-birilərinə deyəndə onları ələ saldılar, saleh insanlar deyəndə ki – biz Allaha tövbə edir, ona dönürük – onlara güldülər, lakin son aqibət necə oldu ? Nəticə nə oldu ? Nə əldə etdilər ? – Allahın razılığını. Ona görə də bil ki, Peyğəmbərimizə*–sallalahu aleyhi vəssəlləm–* lağ edirdilər, onu sehrbaz, dəli, yalançı günahkar adlandırırdılar, lakin son nəticə olaraq o gəlmiş-keçmiş bütün insanların ağası kimi dünyadan köçdü – Allahın salamı və xeyir duası onun üzərinə olsun.

İbrət son nəticədədir. Bu istehzalarla Allah sənin günahlarını silir, bunu sənin dərəcələrini qaldırması üçün edir. Sənə nə bu istehza və lağlağıdan ?(qoy etsinlər!), Qiyamət günü Allahın qarşısında düşmənlər toplanacaq. Necə ki, onlar Allaha itaət edənlərə istehza edirdilər, itaətkar qullar da onlara istehza edəcəklər :

﴿ فَالْيَوْمَ الَّذِينَ آمَنُوا مِنَ الْكُفَّارِ يَضْحَكُونَ (34) عَلَى الْأَرَائِكِ يَنْظُرُونَ (35) هَلْ ثُوِّبَ الْكُفَّارُ مَا كَانُوا يَفْعَلُونَ (36) ﴾

“O gün iman edənər kafirlərə güləcəklər.35.Taxtların üzərində ətrafa baxacaqlar ki 36. Kafirlər öz törətdikləri əməllərin qarşılığını aldımı ?“ (Mutaffifin 34-36)

Bu xeyirlərə görə sevin ey qardaşım, Allaha tərəf gəl ! Əgər sənə şərli insanlar istehza etsələr qarşılığında Allah sənə xeyirli insanların məhəbbəti ilə əvəz edər. Sənə Allahdan uzaq düşənlər xor baxsa, dəyər verməsə, səni Allaha yaxın olanlar sevər və ucaldar. Bu iki tayfa birbirindən necə də uzaqdır. Bil ki, Allah öz ordusunu qalib edəcək, bu elə bir vəddir ki, Allah ona əsla xilaf çıxmaz. Sələfdən bəzisi demişdir: Vallahi qul Allah üçün hansısa aşağı məqama düşərsə, Allah onu düşdüyündən daha uca məqama qaldırar – yəni əgər sən sabit olsan və Allaha itaət etsən, insanlar sənə istehza etsə, Allah səni elə məqama qaldırar ki, insanlar sənə hörmət və ehtiram edər.Buna görə də bəzi kəslər dinində sabit, düz yolda irəliləyən bir gənc, itaətkar birini görərkən öz-özlüyündə düşünürlər ki, bu gənc nəsə böyük bir şeyə doğru irəliləyir. Vallahi hətta Allaha asi olanlar belə itaətkar qullara hörmət, ehtiram nəzərləri ilə baxırlar. Bu asi insanlardan neçə dəfələrlə öz qulağımla eşitmişəm ki, etiraf edib deyirlər : “Biz də bu xeyirli qullar kimi olmaq istəyirik, biz onlarda Allaha yaxın olmaqdan təmkinlilik, vüqar, sükunət, arxayınlıq görürük, biz də onlar kimi olmağı təmənni edirik, onların mislində olmaq arzusundayıq.” 1-ci dəfə istehza, 2-ci dəfə ələ salma, lakin yaxşı sonluq təqvalı olanlarındır (yəni Allahdan qorxanların, Onun hədlərini aşmayanlarındır) :

﴿ وَالْعَاقِبَةُ لِلْمُتَّقِينَ ﴾“Son aqibət müttəqilərindir (Allahdan qorxanlarındır)” (Əraf 128).Uca Allahdan, Ərşin Sahibi əl-Kərim olan Rəbbimizdən istəyirəm ki, bizi insanların Rabbinə itaətdən camaatın istehzası məhrum etməsin.Ümidlərin tükənməmiş və qəfil əcəl gəlməzdən öncə öz nəfsini xilas et ! Onun yanında insana etdiyi saleh əməl və sözlərdən başqa heç nə fayda verməz. Allah təalə ən doğrusunu bilir.

## Aşura günü orucunun fəziləti

Sual : Aşura günü orucunun fəziləti nədir ? Bu günlərdə biz məhz o ərəfədəyik.

Cavab : İbn Abbasdan–*radıyallahu anhu*– gələn hədisdə Peyğəmbər–*sallalahu aleyhi vəssəlləm*– onun fəzilətini bildirmişdir : Bu oruc əvəzini (savabını) Allahdan gözləməklə insandan bir illik günahlarını silir.

Aşura orucunun böyük fəziləti var, insan gərək öz oruclarında ciddiyətlə çalışsın. Bu orucun əfzəli 9 və 10-cu günlərdə oruc tutmaqdır.Çünki Peyğəmbər–*sallalahu aleyhi vəssəlləm*– demişdir : " Yaşasam gələn il 9-u və 10-u oruc tutacam. " Ona görə də orucu sabah və birigün tutun, Allah ən doğrusunu bilir.

Aşura orucu kiçik və böyük günahları silir.

Sual : İbn Abbasdan–*radıyallahu anhu*– gələn hədisdəki kimi Aşura orucu bütün günahları silirmi ?

Cavab : Bu hədisi bəzi alimlər kiçik günahlar üçün qeyd ediblər və deyiblər ki, böyük günahlar üçün səmimi tövbə lazımdır. Ancaq hədisin zahirini götürdükdə o həm böyük həm də kiçik günahlara şamil olunur. Əsl odur ki, hədis mütləq şəkildə götürülür, burda isə ona qeyd kimi gələn ayrıca bir dəlil yoxdu. Zahir olan budur ki, inşəallah həm böyük, həm də kiçik günahları silir. Bu Allah üçün heç də çətin deyil.Allah ən doğrusunu bilir.

Qul dörd şey barəsində soruşulmayınca yerindən tərpənməyəcək – hədisinin mənası

Sual : Səhih hədisdəki Peyğəmbərimizin–*sallalahu aleyhi vəssəlləm*– bu sözünün anlamı nədir : " Qul dörd şey barədə soruşulmayınca yerindən tərpənməyəcək : ömrünü harda keçirdiyindən..."

Cavab : Bu hədis axirət saatından görüntülərə dəlalət edən hədisin bir hissəsidir və o sual-cavab haqdadır.İnsanlar 2 qismdir : Mömin və kafir.Kafir qiyamət günü adicə dayanmaqla Arasatdan[1] (meydandan) götürülüb cəhənnəmə atılacaq – Allah qorusun.Möminə gəldikdə isə o Qiyamət günü Arasatda (meydanda) etdiyi saleh və pis işləri ölçüsündə bəla və sıxıntılara məruz qalacaqdır. Əgər onun böyük günahları olarsa və o şahidlik etsə ki – Lə iləhə illəllah Muhəmmədən Rasulullah– Allah onu bu günahlara görə hesabata çəkəcək.[2]

---

[1] Haqq-hesab meydanı

[2] "Əşhədu ən Lə iləhə illəllah və əşhədu ənnə Muhəmmədən Rasulullah" – bu kəlimeyi şəhadətdir.Bu sözü bilib demək hər bir müsəlmanın borcudur.Lakin bu sözün yalnız tələffüz etməklə fayda verəcəyinə inanmaq olmaz, çünki hər bir sözün mənası, şərtləri, tələbləri olduğu kimi bu sözün də öz mənası, şərtləri və tələbləri vardır. İnsana vacib olan onu İslama salan bu kəlimənin mənasını, tələblərini öyrənib ona əməl etməsidir.Müxtəsər olaraq bunu açıqlayan bir fətvanı sizə təqdim etmək istəyirəm. Sual Səudiyyənin keçmiş müftisi olan Abdulaziz ibn Bəəzə

(Allah ona rəhmət etsin) verilmişdir: “Lə iləhə illəllah və Muhəmmədən Rasululah şəhadətinin mənası nədir?” Şeyx cavabında :

Bu iki şəhadət İslamın əsli, dinin əsasıdır. Bu iki kəliməni deməklə kafir İslama daxil olur. O bununla İslam əhlindən sayılır və ondan İslamın digər vacibatları tələb olunur.O ki qaldı Lə iləhə illəllah şəhadətinə - o bütün dinlərin əsli və əsasıdır.Bütün peyğəmbərlər – Adəmdən bu günümüzə qədər Nuh, Hud, Saleh, İbrahim (Allahın salamı onların üzərinə olsun) – hamısı öz ümmətini bu kəliməyə çağırmışdır. Allah təalə buyurur :

﴿ وَلَقَدْ بَعَثْنَا فِي كُلِّ أُمَّةٍ رَسُولًا أَنِ اعْبُدُوا اللَّهَ وَاجْتَنِبُوا الطَّاغُوتَ﴾”Biz hər ümmətə: “Allaha ibadət edin, Tağutdan (Allahdan başqa ibadət olunanlardan) çəkinin! – deyə peyğəmbər göndərmişdik.” (Nəhl 36) və digər ayədə isə : ﴿ وَمَا أَرْسَلْنَا مِنْ قَبْلِكَ مِنْ رَسُولٍ إِلَّا نُوحِي إِلَيْهِ أَنَّهُ لَا إِلَهَ إِلَّا أَنَا فَاعْبُدُونِ﴾ “(Ya Rəsulum!) Səndən əvvəl elə bir peyğəmbər göndərmədik ki, ona: “Məndən başqa heç bir haqq ilah yoxdur. Buna görə də yalnız Mənə ibadət edin!” – deyə vəhy etməyək.” (Ənbiya 25).Bizim peyğmbərimiz Muhəmmədi– *sallalahu aleyhi vəssəlləm* - də Allah təalə öz qövmünə göndərdikdə bununla başladı və dedi :”Lə iləhə illəllah deyin və (oddan) xilas olun.” Onların Kəbə, onun ətrafında və başqa yerlərdə çoxlu ilahları (ibadət olunan varlıqlar) olarkən, özləri isə bütlərə və ağaclara ibadət etdikləri vaxtı özlərinə deyilən bu sözü inkar edərək dedilər :

﴿ أَجَعَلَ الْآلِهَةَ إِلَهًا وَاحِدًا إِنَّ هَذَا لَشَيْءٌ عُجَابٌ﴾“Əcaba, o, (Lə iləhə illəllah - Allahdan başqa heç bir haqq ilah yoxdur deməklə) ilahların hamısını bir ilahmı etdi? Bu, doğrudan da, çox təəccüblü bir şeydir.” (Sad 5) Küfrləri, doğru yoldan azmaları, ata-babalarının üzərində olduğu şirk (Allaha şərik qoşmaq) və küfrə, çoxlu ilahlara ibadət etmələrinə etimad edərək tövhidi (tək ilahlığı) və imanı inkar etdilər.Səhih hədisdə gəldiyi üzrə bu kəlimə (Lə iləhə illəllah) imanın ən üstün şöbəsidir. Rasulullah– *sallalahu aleyhi vəssəlləm* demişdir : “İman 70-dən çox şöbəsi vardır, ən üstünü Lə iləhə illəllah, ən aşağısı isə yoldan əziyyət verən şeyləri götürməkdir.” Bu hədis bizə sübut edir ki, dinin əsli və əsası, ən fəzilətli və üstün kəlimə Lə iləhə illəllah-dır.Mənası – Allahdan başqa haqq ilah yoxdur. Bu söz Allahdan başqa hər şeyin ilahlığını (ibadət olunmasını) inkar edir və ilahlığı yalnız Allah üçün isbat edir.Səhih Müsimdə İbn Ömərdən– *radıyallahu anhu* rəvayət olunur ki, Peyğəmbər– *sallalahu aleyhi vəssəlləm* dedi: “İslam beş şey üzərində bina olub : 1.Allahı təkləşdirmək 2.Namaz qılmaq 3.Zəkat vermək 4.Ramazan orucu tutmaq 5.Allahın evini (Kəbəni) həcc etmək” digər ləfzdə isə : “1.Tək Allaha ibadət edib ondan başqalarını inkar etmək...” Burada Peyğəmbərimiz– *sallalahu aleyhi vəssəlləm* Allahı təkləşdirməyi, tək ona ibadət etməyi və başqa ibadət olunanları inkar etməyi Lə iləhə illəllahın mənası etdi.İki Səhihdə (Səhih Buxari və Səhih Müslim) Əbu Hurreyradan– *radıyallahu anhu* gələn hədisdə Cəbrail– *aleyhisələm* İslam haqda soruşarkən Rasulullah– *sallalahu aleyhi vəssəlləm* deyir: “İslam Allaha ibadət edib heç nəyi ona şərik qoşmamaq, namaz qılmaq...”.Burada da ibadəti tək Allaha edib heç nəyi ona şərik qoşmamağı Lə iləhə illəllahın mənası etdi. Yəni ibadəti tək Allaha isbat edib yalnız ona xaslaşdırmaq, başqa şeylərə ibadətin batilliyinə etiqad etməkdir.Allah təalə buyurur :

﴿ذَلِكَ بِأَنَّ اللَّهَ هُوَ الْحَقُّ وَأَنَّ مَا يَدْعُونَ مِنْ دُونِهِ هُوَ الْبَاطِلُ﴾“Bu belədir. Çünki Allah Haqdır. (Kafirlərin) Ondan başqa yalvardıqları isə batildir.” (Həcc 62).Bu Lə iləhə illəllahın mənasıdır – İbadəti, ilahlığı yalnız tək Allaha isbat, ondan başqalarını isə inkar etməkdir. Dua etdikdə (çağırdıqda) yalnız Allaha dua edilir, yalnız Ondan kömək istənilir, yalnız Ona təvəkkül edilir, yalnız Ona

görə nəzir verilir, yalnız Ona qurban kəsilir, eləcə də bütün ibadətlər....Buradan da ey sual verən və bizə qulaq asan əziz yoldaş, bilirsən ki, bəzi cahillərin etdiyi kimi qəbirlərdə övliyalara və ölülərə edilən dua və onlardan kömək istəmək, həmçinin ağac,daş və bütlərə dua etmək onlardan kömək istəmək böyük şirkdir. Bu əməllər Lə iləhə illəllah sözünü batil edir.

”Muhəmmədən Rasulullah” şəhadətinin mənası isə onun Allahın elçisi olmağına, insanlara və cinlərə müjdə verən və qorxudan peyğəmbər olaraq göndərilməsinə və özündən sonra bir daha olmayacaq sonuncu peyğəmbər olmasına iman gətirməkdir, Allah təalə deyir :

﴿ مَا كَانَ مُحَمَّدٌ أَبَا أَحَدٍ مِنْ رِجَالِكُمْ وَلَكِنْ رَسُولَ اللَّهِ وَخَاتَمَ النَّبِيِّينَ ﴾“Muhəmməd aranızdakı kişilərdən heç birinin atası deyildir. Lakin o, Allahın Elçisi və peyğəmbərlərin sonuncusudur.“ (Əhzab 40).Digər ayədə isə :

﴿ يَا أَيُّهَا النَّبِيُّ إِنَّا أَرْسَلْنَاكَ شَاهِدًا وَمُبَشِّرًا وَنَذِيرًا (45) وَدَاعِيًا إِلَى اللَّهِ بِإِذْنِهِ وَسِرَاجًا مُنِيرًا ﴾“45.Ey Peyğəmbər! Həqiqətən, Biz səni şahid, müjdəçi və xəbərdar edən olaraq göndərdik.46. (Səni) həm də Allahın izni ilə Ona tərəf çağıran və nur saçan bir çıraq kimi (göndərdik).” (Əhzab 45-46) O Allahın haqq peyğəmbəridir, Allah onu bütün cin və insanlara Allahı təkləşdirməyə və ona şərik qoşmaqdan qorxutmağa (çəkindirməyə) göndərmişdir. Allah təalə buyurur :

﴿ قُلْ يَا أَيُّهَا النَّاسُ إِنِّي رَسُولُ اللَّهِ إِلَيْكُمْ جَمِيعًا ﴾“De: “Ey insanlar! Şübhəsiz ki, mən sizin hamınız üçün Allahın elçisiyəm.”(Ə`raf 158), və digər ayədə isə:

﴿ وَمَا أَرْسَلْنَاكَ إِلَّا كَافَّةً لِلنَّاسِ بَشِيرًا وَنَذِيرًا ﴾“(Ya Rəsulum!) Biz səni (təkcə öz qövmünə deyil) bütün insanlara (möminlərə Cənnətlə) müjdə verən, (kafirləri isə Cəhənnəm əzabı ilə) qorxudan bir peyğəmbər olaraq göndərdik.” (Səbə 28).Hər bir müsəlman kişi və qadına – hər bir kəsə vacibdir ki, Muhəmmədin– *sallalahu aleyhi vəssəlləm* Allahın Rəsulu olmasına iman gətirsin.Hər bir həddi büluğa çatmış müsəlmana, yəhudiyə, xristiana və başqalarına – bütün mükəlləf insanlara Allahdan başqa haqq ilahın olmamağına şahidlik edib onu bunda təkləşdirib, ibadətləri Ona xas etmək və bütlər, ağaclar, daşlar, övliyalar, peyğəmbərlər və başqalarına ibadətdən uzaqlaşmaq vacibdir.Həmçinin onların Muhəmmədin– *sallalahu aleyhi vəssəlləm* Allahın Rəsulu olmasına iman gətirib onu haqq olaraq təsdiq etməsi, onun əmrlərini yerinə yetirib qadağalarından çəkinməsi, Allaha yalnız onun kimi (onun şəriəti ilə) ibadət etməsi “Muhəmmədən Rasulullah” şəhadətinin mənası deməkdir – yəni Onun verdiyi xəbərləri təsdiqləmək, əmrlərinə itaət etmək, çəkindirdiyi və qadağan etdiklərindən uzaqlaşmaq və gətirdiyi şəriətlə ibadət etməkdir – arzu-istəklərlə, düşüncə və bidətlərlə yox.Bu iki şəhadət bir az öncə də keçdiyi kimi dinin əsli və əsasıdır. Kim bunları dili ilə deyib mənasına etiqad etsə o müsəlmandır və ondan İslamın digər haqları – namaz, zəkat, oruc, həcc və Allahın və Rəsulunun– *sallalahu aleyhi vəssəlləm* əmr etdiyi başqa əmrlərini yerinə yetirib, haram etdiyi zina, oğurluq, nankorluq və başqa haramlardan uzaqlaşmaq tələb olunur.Həmçinin ondan tövhidin (Tək Allaha ibadət etməyin) ziddi olan böyük şirkdən çəkinmək tələb olunur. Çünki onun tövhidi yalnız bu halda tamamlanır.Bundan əlavə insandan şəhadət kəliməsini təhqiq edərək Allahın və Rəsulunun– *sallalahu aleyhi vəssəlləm* qadağan etdiyi bütün söz və əməllərdən uzaqlaşması istənilir. Müvəffəq edən Allahdır.(Mənbə: “Nurun ələd-dərb”, http://www.binbaz.org.sa/mat/19852 )

Sual meydanında hesabat necə olacaq ? 2-ci qism olan möminlər də 3 dərəcədir :

- 1-ci dərəcə - Bunlar heç nədən soruşulmayacaq. Allahın əmri ilə onlar birbaşa Cənnətə salınacaqlar. Onlar Muhəmmədin ümmətindən olan 70 min nəfərdir. Allah onlara Cənnətə hesab vermədən, soruşulmadan, əzab verilmədən daxil olmasına izn verəcək. Allahdan bizi və sizi onlardan etməsini diləyirik.
- 2-ci dərəcə - Onlar xeyirləri çox olandır. Allah onları xətaları mövcud olmasına baxmayaraq sevib. Qiyamət günü meydanda da Allah onların xətalarını örtəcəkdir. İbn Ömərdən*–radıyallahu anhumə–* gələn hədisdə deyilir : “Allah qulu yaxınlaşdırar və deyər : Ey qulum bu gündə və bu gündə bunu və bunu etdin. Qul deyər : Bəli ey Rabbim. Allah : Bunu və bunu da etdin. Qul : Bəli ey Rabbim. Allah deyər : Bunları sənin üçün dünyada örtdüm və Mən bugün də onları sənin üçün örtürəm “
- 3-cü dərəcə isə : Bunları Allah ifşa edər və aşkara çıxarar : Bu sual-cavab üçün olan toplanmadır : “ Qul 4 şey haqda soruşulmayana qədər ayağı yerdən tərpənməyəcək “ – bunlardan sual-cavabda varid olduğu üzrə : “gəncliyindən, başqa rəvayətdə isə - ömrünü necə keçirtməyindən, gəncliyini necə sərf etdiyindən... “ (soruşulmasıdır). Ömür, hansı ki bu həyatın anlarıdır, az da olsa, çox da olsa insan soruşulacaq və ona dünyanın günləri günbəgün ərz olunacaq. Qiyamət günü meydanda sənə günlərin bir-bir təqdim olunacaq. Hər gün saatbasaat ərz olunacaq, hər saat dəqiqəbədəqiqə, hər dəqiqə saniyə-saniyə soruşulacaq. Ona görə də Peyğəmbər*–sallalahu aleyhi vəssələm–* demişdir : “Kim hesaba çəkilərsə əzab olunmuş olar “ – yəni əgər ömrün hesabatı dəqiq aparılarsa o həlak olar.Heç kəs buna əsla şübhə etməməlidir ki, əgər Allah onu dəqiq hesaba çəksə, o həlak olar. Çünki Allahın nemətləri saysız-hesabsızdır, lakin buna müqabil ona qarşı yamanlıq, təqsir isə hər kəsdə mövcuddur, hətta bu insan xeyir əhli, düzgün biri olsa belə.

  Və ona gəncliyi və sağlamlığı təqdim olunar, ona keçirtdiyi anlar ərz olunar – filan saatda filan saniyədə, bu və bu gündə, bu və bu ayda, bu ildə və bu ildə...və deyilər : Filan anda bunu və bunu etdin, öz dostlarınla oturdun və

dedilər : belə belə...sən dedin : bunu və bunu...Dediyin sözlərin hamısı zikr olunar, ondan bir hərf belə salınmaz. İnsana hamısı ərz olunar, hətta xardal dənəsi  qədər belə unudulmaz.Qiyamət günü ədalət tərəziləri qurular.Allah təbərakə və təalə deyir :

﴿وَنَضَعُ الْمَوَازِينَ الْقِسْطَ لِيَوْمِ الْقِيَامَةِ فَلَا تُظْلَمُ نَفْسٌ شَيْئًا وَإِنْ كَانَ مِثْقَالَ حَبَّةٍ مِنْ خَرْدَلٍ أَتَيْنَا بِهَا وَكَفَى بِنَا حَاسِبِينَ﴾

“Biz qiyamət günü üçün ədalət tərəzisi quraraq. Heç kəsə əsla haqsızlıq edilməz. Bir xardal dənəsi ağırlığında olsa belə onu (hər hansı bir əməli tərəziyə) gətirərik. Haqq-hesab çəkməyə Biz kifayətik.”(Ənbiya 47).Qiyamət günü meydanında əzəmətli və dəhşətli səhnə olar, o dərəcədə ki, bu salehlərin saçını ağardar və onları təşvişə salar :

﴿كَانُوا قَلِيلًا مِنَ اللَّيْلِ مَا يَهْجَعُونَ﴾ “ Onlar gecənin az bir qismini yatırdılar” (Zariyat 17). Ona görə də, Allahın saleh bəndələri bu meydan və sorğu-sual haqqında xatırlandıqda dözə bilmirlər, qorxuya düşürlər və saleh əməllərini çoxaldırar. Ümid edrilər ki, Allah onların həmən günü üzüntü və sıxıntılardan xilas edər.Özlərini bu yolda fəda edirlər ki, sabah da rahatlıq tapsınlar.

Qəsd olunan odur ki, Allah sənə bu anları təqdim edəcək, sənə bu saatlar ərz olunacaq. İnsanlardan eləsi olacaq ki, Allah ona yaxşı əməllərini göstərərək deyər : Ey qulum, bu gündə və bu gündə bunu və bunu etdin, qul deyər : sənin sayəndə ey Rabbim. Allah : Filan və filan gündə filan saatda salehlərlə oturdun. Qul : sənin sayəndə ey Rabbim. Allah : Filan və filan gündə qardaşını Allah üçün ziyarət etdin, filan gündə qohumlarınla əlaqə saxladın, filan gündə miskinlərə sədəqə verdin, dul qadına yardım etdin, bunu etdin, onu etdin...Qul : Sənin sayəndə ey Rəbbim, Sənin sayəndə ey Rəbim...Allah ona deyər : Cənnətə daxil ol !

Allah səni təqsir və pisliklərindən uzaqlaşdırar, Allah istədiyini edər, hökm verər və heç kəs onun verdiyi hökmü müzakirə edə bilməz. Əvvəl və sonrakıların başı üzərindən kim Qiyamət günü çıxıb Allaha deyə bilər ki : Ey Rabbim filankəsi Cənnətə daxil etmə ! Kimsə bunu əsla bacarmaz. Əgər Allah sənə rəhm etsə heç kəs sənə əzab verə bilməz, Allah əzab versə heç kəs rəhm edə bilməz. Kim bacarar Allahın hüzurunda danışsın ?! Allahın mələklərinə bax, o mələklərdən biri qanadlarını açsa üfüqü tutar. Lakin bununla bərabər onlar susar və Allaha boyun əyərək danışmağı bacarmazlar, baxmayaraq ki, Allah onlara cism cəhətdən genişlik, böyüklük verib. Onlar Allahın Əzəməti qarşısında geri çəkilərlər. Bu böyük gündə Onun Əzəməti qarşısında boyun əyərlər.Hər bir söz, hər bir əməl barəsində soruşular. İnsana hər şey bütünlüklə təqdim olunar, xardal dənəsi qədər

də unudulmaz.Allahdan bizi və sizi bu durumdan xilas etməsini, hesabatımızı yüngül etməsini, çətinliyə salmamasını diləyirik. Allah ən doğrusunu bilir.

## Əməli düzgün olmayan dostlarla davranma tərzi

Sual : İstəyirəm Allaha tövbə edim, artıq islah və hidayət yoluna yönəlmişəm, lakin mən bir saat saleh insanlarla oluramsa da vaxtımın çoxunu yaxşı əməlli olmayan gənclərlə keçirirəm və onları tərk edə bilmirəm, çünki onlar həmişə mənimlə olurlar. Mən nə edim ey şeyx, mənə istiqamət verin, Allah sizi xeyirlə mükafatlandırsın.

Cavab : Əvvəlcə səni Allahın neməti olan tövbəni etdiyinə görə təbrik edirəm. Allah tövbəni yalnız sevdiyinə nəsib edir və Allah yalnız sevdiyi insanın qəbinə tövbə və peşmançılıq hissini qoyur.Bu xeyirin başlanğıcıdır, necə ki Alimlər deyir : "Tövbə peşman olmanın dəlilidir və ya peşmançılığın səmərələrindən biridir." Nə qədər ki, sən Allaha doğru gəlmisən, o zaman ona yaxınlaşmağını daha da artır. Allaha doğru yaxınlaşdıqca nəfsinin rahatlıq tapmasına nəzər yetir.Sənin yoldaşlarına gəldikdə isə , sənə iki şeyi nəsihət edirəm : 1-ci iş – Onlar sənin yanına gəldikdə sənə nə mane olur ki, onlara hidayət çırağı (hidayətə yönəldən) olasan. Onlara Allahı xatırlat. Allah üçün sənə deyirəm ey qardaşım, onlarla oturduqda Cənnəti və Cəhənnəmi onlara xatırlat, onlara Allahın gecə və gündüz verdiyi nemətləri yada sal ki, bu nemətlərdən istifadə edirlər. Onları Allaha itaət etməyə çağır. Nə bilirsən bəlkə də sənin qəlbinin dərinliklərindən çıxan bu nəsihətlə Allah özünə itaət etməyən, namaz qılmayan bir insanın köksünü İslama açar. Bəzi gənclər uğurlu və müvəffəqdir, əgər onun qəlbinə hidayət daxil olsa o insanları Allahın dininə daxil etməyənə qədər rahatlıq tapmaz.

Bəzi insanlar mübarəkdir (bərəkətlidir), əgər imanın şirinliyini dadsa onu Allahdan digər insanlara çatdırmayana kimi ürəyi rahat olmaz. Bu Vallahi ki, insanların ən xeyirlisidir və onların ən ucasıdır.Əgər o Allahı sevsə  və imanın şirinliyini dadarsa istəyər ki, onu hər kəslə bölüşsün və o hidayət olmazdan əvvəl bərabər olduğu dostlarının yanına gedər və onlara deyər : Mən qəlbimdə Allaha yaxın olmaqla rahatlıq tapdım – onlara Allahı xatırladar.Ey qardaşım, sənin dəyərli əlaqələrin, imkanların və qiymətli kəlimələrin, həmçinin gözəl həyatın var. Öz yoldaşına bax, onda heç bir xeyir yoxdu, lakin sənin yanına gəlib oturur və sənə deyir : Ey filankəs, nə deyirsən bəlkə bugün gecəni bizimlə keçirdəsən, gecəni dənizdə, orda, burda keçirək –xülasə o Allaha asiliyi sənə gözəlləşdirir və bəzəkli göstərir. Elə isə sən ona niyə demirsən ki : Ey qardaşım, nə deyirsən bəlkə məscidə gedək ? – nə qədər ki, o səni həlak və fəsada yönəldir, bəs sən niyə onu xilas və islah olmaq yoluna çağırmırsan ? Ona de : Nə deyirsən bəlkə səninlə birgə məscidə bərabər getməyi yoxlayaq ? – Olar ki uğur əldə edəsən. Bir asi olan şəxsi xeyir

məclislərindən birinə dəvət edəsən və Allah onun köksünü İslama açar, bu da sənin xeyir əməllərinə yazılar.Bu gəlirli, xeyirli bir ticarətdir. Ola bilər ki, bu yola dəvət etdiyinə görə Allah sənin günahlarını bağışlayar.

Bunu təcrübə et ey qardaşım ! Bu sizin atalarınızın, babalarınızın dinidir. Vallahi dini təbliğ etmək, başqalarına çatdırmaq sənin üçün şərəfdir. Allahın dinini çatdırmaq nə eyb, nə alçalmaq, nə də ki zəlillikdir, bu sənin və atalarının dinidir. Allaha itaət etmək qətiyyən eyb deyil, lakin əsl eyb Onun nemətlərini yemək, suyundan içib bu nemətlərə nankorluq etməkdir. Budur əsl eyb Vallahi, bütün eyb Allahın nemətlərinə qarşı nankor olmaqda davam etmək və Allaha asiliyə çağırmaqdır. Ancaq Allaha itaətə çağırmaq isə şərəfdir.Pis yoldaşlarına Allahı xatırlat, onlara de : Vallahi sizin indi yaşadığınız həyatı, mən də yaşamışam və o həyatda çox əzab əziyyət, sıxıntılar görmüşəm, rahatçılıq da tapa bilmədim.Bu rahatçılığı yalnız Allaha yaxınlıqda hiss etdim.Onlara Allahla əlaqə qurmağı, ona yaxınlaşmağı təklif et.

2-ci işin isə : Əgər sənə qulaq asmasalar onların hidayətə gəlmələri üçün Allaha dua et və onlardan uzaqlaş, Allah sənə onlardan daha xeyirliləri ilə əvəz edəcək.Bil ki, Allah üçün nəyi tərk etsən Allah ondan daha xeyirlisini sənə qismət edər.Əzəmətli Allahdan, Ərşin Sahibi Rəbbimizdən istəyirik ki, sənə onlardan uzaqlaşmağa kömək etsin. Allah onlara hidayət istəyirsə hidayət versin ya da qəlbərini səndən çevirsin. Sənin də qəlbini onlardan çevirib xeyirli insanlara yönəltsin. O doğruya yönəldən və buna qadirdir.Allah ən doğrusunu bilir.

## Qəlbdə xuşu (itaətkarlıq, mütilik) əldə etməyin yolları

Sual : Qəlbimə xuşunun daxil olması üçün müəyyən bir vasitə varmı ?

Cavab : Müxtəsər şəkildə buna yol Allaha dua etməndir, de : Allahım Səndən itaətkar qəlb istəyirəm, bu xuşu (itaətkarlıq, boyunəymə) Allahın əlindədir. 1-cə anda qəlb olduğundan daha sərt olur və əgər Allah sənin qəlbinə itaət nurunu qoysa sən ayə eşitdiyin an ona tabe olarsan. Kimlərdənsə Allahın kitabından bir söz eşitdiyin elə vaxt olmaz ki, sən ona itaət etməyəsən. Buna görə bəzi insanlar görərsən ki, adicə Qurandan nəsə eşitsələr qəlbləri Allaha bağlanar, buna dözə bilməzlər, sən ona Allahın kitabından bircə ayə oxusan itaətkarlığın kamilliyindən oturub ağlayar. Əzəmətli Allahdan bizi və sizləri belə kəslərdən etməsini diləyirik.Kim bu xuşudan məhrum olarsa o çox şeydən məhrum olar.Allahdan qəlblərimizi özünə itaətkar etməsini istəyirik, çünki Allah deyir :

﴿فَوَيْلٌ لِلْقَاسِيَةِ قُلُوبُهُمْ مِنْ ذِكْرِ اللَّهِ أُولَئِكَ فِي ضَلَالٍ مُبِينٍ﴾ “Allahın zikrinə qarşı qəlbləri sərtləşmiş kimsələrin vay halına, onlar açıq-aydın zəlalət içindədirlər “ (Zumər 22)

Hər bir halda əgər xuşulu olmaq istəsən birinci edəcəyin şey Allaha dua etməndir. Sonra saleh insanları ziyarət etmək, 3-cü gözəl mühazirə və yığıncaqlara qatılmaq, 4-cü Quran oxumaq və ondan təsirlənmədir. Allahın izni ilə xuşunu hiss edəcəksən.Əzəmətli Allahdan bizi qəlbimizin itaətkarlığı ilə nemətləndirməsini istəyirik.Allah ən doğrusunu bilir.

## Daima Allahdan qorxmaq haramları tərk etmək üçün ən böyük vasitələrdəndir

Sual : Mən pis, əxlaqsız filmlərə baxmaq, tərbiyəsiz və biyabırçı jurnalları oxumaq xəstəliyinə tutulmuşam, – Allah bizi belə bəladan qorusun – bundan xilas olmaq istəyirəm. Mənə nə etməyi məsləhət görürsünüz, bu bəladan xilas olmağın yolu varmı ? Allah sizi xeyirlə mükafatlandırsın.

Cavab : ( Şeyx bu sualı eşidib dərindən içini çəkir və təəssüflənir...) Allahdan kömək istəyirik. Allahu Əkbər, Subhənəllah ! Yəni bu gözlər...Əgər bu insan Qiyamət günü meydanda Allahın qarşısında duracağını təsəvvür etsəydi...Allah ona deyər : Ey qulum, Məndən həya etmədinmi, utanmadınmı ? Sən heç nə görməyən koru görmədinmi, səni isə bu gözlə nurlandırdım ki harama baxasan ? Bu asilik... Bəzən insan Allahın haram etdiyinə çağıran filmdən müəyyən bir parçanı, bir hissəni və ya bir asiliyi görür və bununla Allah qula elə qəzəblənir ki, bir daha ondan razı qalmır – Allah bizi qorusun – Bəzən bu qəlbdəki iman nurunu elə söndürür ki, qəlb Allahla qarşılaşan ana kimi zülmətdə qalır.Asilik çox təhlükəlidir.Ey qardaşlar, asilik qəlbləri öldürür, iman nurunu söndürür. Allah Allah ! Qiyamət günü gəldikdə Allahın qarşısında dayanarkən sənə bu yaşadıqların tam şəkildə, bir anı belə unudulmadan təqdim olunacaq. Bu gözlər cəhənnəmin mismarı ilə çıxarılacaq, ətrafı od ilə sürmələnəcək.İnsan bu filmlərə baxmaqla ləzzət alır, lakin bu Qiyamət günü üçün həsrət, üzüntü və peşmançılıqdır. Həm də gərək insan dürüst şəkildə bir özünə sual versin, ey qardaşım, özündən soruş : Bu baxdığından nə əldə etdin ? Səmərəsi nədi ? Faydası nədi ? Yaxşı, baxdın və ləzzət aldın, lakin bunun aqibəti nədir ? Qiyamət günü meydana gətirildikdə sənə kitabın (əməllərin yazıldığı kitab) təqdim olunar və sən səhifənə baxarsan, orda Allahın səndən razı qalmadığı baxışı görərsən.

Bir kişidən nəql edirlər ki, o vaxtı ilə elm tələbəsi olur, bir dəfə o alimlə birgə ikən oradakı xristiana gözü sataşır. Bu kafirin gözəl siması var idi və elm tələbəsi bundan məftun olur və gözünü ona zilləyir. Ona yenidən baxdıqda alim arxadan ona : niyə baxırsan? – deyir.Tələbə o andaca nəzərlərini çəkir.Şeyx öz tələbəsinə deyir : Vallahi vaxt gələr sən bu günahının nəticəsini mütləq görərsən – yəni Allah sənə bu günahının qarşılığını həyatının axırında da olsa göstərəcək.Tələbə deyir : Mən bunun aqibətini gözləyirdim, 20 il gözlədim – bu qissəni İmam İbnul-Qeyyim-rahiməhullah- “Mədaricus-salikin” (Zahidlərin dərəcələri) əsərində qeyd

etmişdir – deyir : 20 il mən bunun aqibətini gözləyirdim, bir gecə yatdım – o zaman bu şəxs Quran hafizi olur –səhər açıldıqda mən Allahın kitabını unutmuşdum – Allahdan salamatılıq və bizi qorumasını diləyirəm.

Bəzən insan öz günahlarını Allah qarşısında kiçik görür, lakin o böyükdür.Buna görə də sələfdən bəzisi demişdir : “Asiliyin kiçik olmasına baxma, asiliyi kimə qarşı etdiyinin böyüklüyünə bax”.Bircə nəzər bəzən insanın bütün həyatını məhv edir, harama bircə baxışı ... Allah Allah ! Ey qardaşım, mən sənin ümidini Allahdan üzmürəm, nə də ki, Allahın rəhmətindən heç nə gözləmə demirəm. Əksinə səni xeyirlə müjdələyirəm, səndən bu filmlərə görə peşman olmanı, göz yaşı tökməni istəyirəm. İstəyirəm bir gün evdə öz otağında təkcə oturub Allahı xatırlayasan və deyəsən : “Biz Allaha məxsusuq, biz ona da qayıdacağıq, mən necə bir bəlaya düçar olmuşam ?! Allah mənə göz kimi bir nemət verdi və mən onunla harama baxdım ! Nə qədər filmlərə baxdım ? Nə qədər səhnələr gördüm ? Allahla necə qarşılaşacam ?” Qəlbinin dərinliyindən bu odu alovlandır, hətta gözlərin yaşarsın. Ola bilər ki, bu göz yaşı ömrü boyu işlədiyin günahları silər.Tək olduğun halda göz yaşı axıtmanı istəyirəm. Çünki Peyğəmbərimiz–*sallalahu aleyhi vəssəlləm*– belə göz yaşı axıdan kəsə müjdə verib ki, Allahın öz kölgəsindən başqa heç bir kölgənin olmadığı bir gündə Allah onları kölgələndirəcək – Allah bizi və sizi onlardan etsin. Bu 7 qrup insanın zikr olunduğu hədisdə : “ Allahı tək olaraq xatırlayıb göz yaşı axıdan kişi “ zikr olunur – yəni o bunu Allahın qorxusundan edir, elə isə sən də belə et !

2-ci iş isə - Nəsihət edirəm ki, bu asilikdən çıxıb uzaqlaşasan. Alah sənə yardım edəcək. Vallahi sən öz nəfsində nəyə tövbə edib möhkəm olsan Allah səni müvəffəq edəcək. Şeytan sənə yaxınlaşar və deyər : Yox, sən bunu etdin, sən çox baxmısan, sənə tövbə yoxdur – istəyər ki, ümidini üzsün.Vallahi əgər insan topuğundan saçının ucuna kimi günahlar içində batsa və sonra Allaha qarşı yaxşı zəndə olsa Allah onu doğruya yönəldər və müvəffəq edər.

Səni bu iki şeyi etməyə çağırıram : Günah və asiliyi tərk etmək, etdiklərinə peşman olmaq və Allaha yaxşı zənn bəsləmək. Uca Allahdan sənin günahlarını savablarla əvəz etməsini diləyirəm, o buna yönəldən və qadir olandır, Allah ən doğrusunu bilir.

## Namazı qılmaqda tənbəllik və onun əlacı

Sual : Mən hərdən bəzi namazları qılmaqda tənbəllik edirəm, bunun əlacı nədir ?

Cavab : Namazları qılmaqda tənbəllik etməyin əlacı Allaha duadır ki, səni namazlarını qoruyanlardan, namazlarında daimi olanlardan etsin. Həmçinin bu əlaclardan Allahla qarşılaşmanı və səni bu namazlardan hesaba çəkəcəyini

xatırlamaqdır, çünki Allah səni bu namazlar barədə sorğu-sual edəcək. Əgər sən bilsən ki, Allah onları səndən soruşacaq bu səni namazlarını qorumağa təhrik etdirər. İnsanların namazda ən xoşbəxt olanı onları vaxtında yerinə yetirənlərdir. İnsanlar namazlarına görə müxtəlif dərəcədədirlər : Onlardan vaxtında qılanı, sonradan gəlib qoşulanı var. Hər bir kəs Allahın Rəhməti ilə Onun razılığına nə qədər can atsa o qədər də xilasa nail olar.

Sənin üzərinə düşən namazı vaxtında qılmaqdır.Namazı tənbəllik edərək gecikdirmək (təxirə salmaq) bir neçə cürdür :

1-cisi camaatla namaz qılmamaq, bunun üçün günah və cəza vardır. Eşitsən ki, müəzzin deyir : Hayyə aləs-saləh (namaza tələsin), Hayyə aləl-fələh ( xeyirə tələsin), gözlərin önünə namaz qılmağı gətir. Buna görə də səhabələr müəzzin azan verdikdə bıçaq ətin üzərində ikən namaz qılmayana kimi onu kəsməyi tamamlamırdılar, bu Allahın çağırışına cavab verməyin kamilliyindəndir.

2-cisi namaza yubanmaq və laqeyd yanaşmaqdır, namazı gecikdirməkdir. Şeytan sənə yaxınlaşaraq deyir : İşanın vaxtına hələ var, səni məscidə getməyə çağıran da yoxdur. Bəzi vaxtlarda isə şeytan sənə gələrək bunu deyər : Məscidə niyə gedirsən? Sən özünü insanlara göstərirsən, istəyirsən ki, insanlar sənin haqqında desinlər ki, sən namaz qılanlardansan – istəyir səni Allaha itaətdən məhrum etsin. Əzmini topla və məscidə get. 1-ci gün elə hiss edəcəksən ki, bu iş ağırdır və qəlbin sıxılır. 2-ci gün rahatlaşacaq, 3-cü və 4-cü günü isə camaatla namaz sənin üçün onlarsız səbr edə bilmədiyin yemək və içmək misalında olacaqdır.

Sələfdən bəzisi namazın vaxtını keçirəndə oturub uşaq kimi ağlayırdı.Sələfdən biri haqqında ravi[3] nəql edir ki : Əsr namazından çıxdım, insanların bir yerdə toplandığını gördüm. Dedim ki – onlara nə olub ? Dedilər : Filankəs əsr namazının vaxtını keçirib, buna görə ona təskinlik və təsəlli verirlər.Ona deyirdilər : Əsr namazını keçirtdiyinə görə sənə müsibət baş verib, sən dərəcələri, məqamları və savabları itirmisən - onun dərdinə həmdəm olurdular. Çünki bu dində müsibətdir.Allah sənə rəhm etsin buna bir nəzər yetir ! Bircə namazı keçirib, ancaq ona təsəlli verirlər. Bizim vaxtımızda isə çox sayda namazların vaxtı keçir... Allahdan salamatçılıq və müvəffəqiyyət istəyirik.

Peyğəmbərimiz Muhəmmədə, onun ailəsinə və səhabələrinin üzərinə Allahın salamı və xeyir-duası olsun.

[3] Rəvayət edən

Mündəricat